*© "Metafizika" Journal* *p-ISSN 2616-6879*
*Vol 6, issue 1, serial 21, 2023. pp.198-208* *e-ISSN 2617-751X*

**UOT:** 930.22.
**KBT:** 66.49
**MJ №** 163

# Azərbaycan Respublikasının Yaxın Şərq və müsəlman ölkələri ilə diplomatik münasibətlərin qurulmasında Heydər Əliyevin rolu

**Elnur Mustafayev***

**Abstrakt.** Azərbaycan Respublikası 1991-ci il oktyabrın 18-də dövlət müstəqilliyini bərpa etdikdən sonra dövlətçiliyini inkişaf etdirərək möhkəmləndirmək üçün tarixi fürsət əldə etmiş oldu. Belə bir şəraitdə milli dövlətçilik prinsiplərinə uyğun olaraq yeni xarici siyasət kursunun formalaşdırılması və həyata keçirilməsi ən vacib məsələ kimi qarşıda dururdu. Ermənistanın Azərbaycana qarşı əsassız ərazi iddiaları ilə Dağlıq Qarabağda başlayan erməni separatizmi, eləcə də hərbi təcavüzün genişlənməsi ölkəmizi ciddi siyasi və iqtisadi problemlərlə üz-üzə qoymaqla yanaşı, dövlətimizin xarici siyasət fəaliyyətində də mühüm vəzifələrin yerinə yetirilməsini ön plana çəkdi. Ermənistanın ölkəmizə qarşı hərbi təcavüzünün qarşısını almaq, onun ağır nəticələrini aradan qaldırmaq, dövlətimizin ərazi bütövlüyünü və təhlükəsizliyini təmin etmək, dünyaya siyasi və iqtisadi inteqrasiya olunmaq zərurəti düşünülmüş, ardıcıl və fəal xarici siyasət tələb edirdi.

1993-cü ilin ikinci yarısında ümummilli lider Heydər Əliyevin yenidən hakimiyyətə qayıdışı Azərbaycanda müstəqil dövlətçilik ideyalarının bərqərar olmasına şərait yaratdı. Bundan sonra Azərbaycanın xarici siyasət kursunda mövcud reallıqları nəzərə alan və ölkəmizin milli mənafelərinin qorunmasına yönəlmiş əməli dəyişikliklər edildi. Bu dövrdən başlayaraq həyata keçirilən xarici siyasətimiz məhz Ümummilli Liderin adı və fəaliyyəti ilə bağlıdır. Məqalədə Heydər Əliyevin ikinci hakimiyyət illərində Yaxın Şərq ölkələri, müsəlman və ərəb ölkələri ilə diplomatik münasibətlərin qurulmasındakı göstərdiyi fəaliyyətlərdən bəhs olunur.

**Açar sözlər:** Heydər Əliyev, beynəlxalq münasibətlər, Yaxın Şərq, İslam Əməkdaşlıq Təşkilatı, xarici siyasət

* Fəlsəfə üzrə fəlsəfə doktoru,
AMEA akad. Z.M.Bünyadov adına Şərqşünaslıq İnstitutunun "Din və ictimai fikir şöbəsi"nin müdiri, Şərqşünaslıq İnstitutunun Gənc Alim və Mütəxəssislər Şurasının sədri; Bakı, Azərbaycan
E-mail: elnur.mustafayev88@mail.ru
https://orcid.org/0000-0001-9784-3466

**Məqaləyə istinad:** Mustafayev, E. [2023] Azərbaycan Respublikasının Yaxın Şərq və müsəlman ölkələri ilə diplomatik münasibətlərin qurulmasında Heydər Əliyevin rolu. *"Metafizika" jurnalı, 6*(1), səh.198-208.

***Məqalənin tarixçəsi:***
*Məqalə redaksiyaya daxil olmuşdur: 21.01.2023*
*Təkrar işlənməyə göndərilmişdir: 27.02.2023*
*Çapa qəbul edilmişdir: 13.03.2023*

## 1.Giriş

Özünün zəngin dövlətçilik təcrübəsinə əsaslanaraq dövlətimizin yeni xarici siyasət kursunun əsas istiqamətlərini müəyyənləşdirən ümummilli lider Heydər Əliyevin yeniləşmiş xarici siyasət xəttində, ilk növbədə, bir sıra ən mühüm və təxirəsalınmaz vəzifələrin yerinə yetirilməsi qarşıya qoyulmuşdu.

Həmin vəzifələrdən biri və ən əsası Azərbaycanı beynəlxalq aləmdəki təcrid vəziyyətindən çıxarmaq, ölkəmiz haqqında yaradılmış mənfi ictimai rəyi dağıtmaq, xalqımızın haqq işini dünya ictimaiyyətinə olduğu kimi çatdıraraq, respublikamız ətrafındakı informasiya blokadasını yarmaqdan ibarət idi. Ona görə də yeni xarici siyasət xətti üçün hər şeydən əvvəl müharibə dayandırılmalı və dinc şərait təmin edilməli idi. Bu məqsədlə 1994-cü ilin mayında Ermənistanla atəşkəsə nail olunması, qanunsuz hərbi birləşmələrin buraxılması və ölkə daxilində sabitlik yaradılması yolunda atılan addımlar sayəsində yeni xarici siyasət xəttinin ardıcıllıqla həyata keçirilməsi üçün lazım olan əlverişli dinc şərait yarandı.

Məhz buna görə də dünya birliyinə bərabərhüquqlu üzv kimi daxil olmağa çalışan və müstəqilliyinin ilk addımlarını atan, eləcə də Ermənistanın hərbi təcavüzü nəticəsində ərazi bütövlüyü pozulmuş Azərbaycan Respublikasının xarici siyasətində dünya birliyinə inteqrasiya, ikitərəfli və çoxtərəfli münasibətlər, o cümlədən beynəlxalq və regional təşkilatlarla əlaqələrin yaradılması və inkişaf etdirilməsi ümummilli lider Heydər Əliyevin fəaliyyətinin başlıca istiqamətlərindən birini təşkil edib.

## 2.Heydər Əliyevin İslam Əməkdaşlıq Təşkilatında fəaliyyəti və erməni təcavüzünün beynəlxalq ictimaiyyətə çatdırılması

Yaxın və Orta Şərq ölkələrinin yerləşdiyi region haqlı olaraq ilk insan məskənləri hesab edilir. Dünya tarixində ilk dövlətlərin məhz bu ərazilərdə yaranmasını müxtəlif tarixi faktlar bir daha sübut edir. Minilliklərlə burada yaranmış qədim dövlətlər bütün insan cəmiyyətinə dünya siyasətinin şərtlərini diktə etmiş, uzun tarixi bir müddətə onun əsas istiqamətlərini müəyyənləşdirmişlər.

Azərbaycan müstəqil müsəlman ölkələri ailəsinə qovuşduqdan sonra onlarla əl-ələ verərək həm öz problemlərinin, həm islam dünyasının problemlərinin, həm də dünya siyasəti problemlərinin həllində yaxından iştirak etmək üçün İslam Əməkdaşlıq Təşkilatına üzv olmaq qərarı verdi və bunun üçün dünya səviyyəsində böyük nüfuzu olan bu təşkilata müraciət etdi. 1991-ci ilin dekabrında ona üzv qəbul edildi və ilk andan da bu təşkilatın ən fəal üzvlərindən birinə çevrildi. Bu fəallıq Heydər Əliyev hakimiyyətə gəldikdən sonra daha da artdı, titanik bir əməyə çevrildi. Bunun nəticəsində müsəlman dövlətləri və ölkələri arasında qarşılıqlı əməkdaşlığı möhkəmləndirmək, müsəlman xalqlarının əmin- amanlığını və

təhlükəsizliyini, sülh şəraitində yaşamasım təmin etmək, onların rifahını yüksəltmək, mənəvi dəyərlərimizi, mədəniyyətimizi, dinimizi, ənənələrimizi və mədəni abidələrimizi qoruyub saxlamaq və daha da inkişaf etdirmək devizini özünə rəhbər tutan bu böyük beynəlxalq təşkilatla yaxından əməkdaşlıq etmək, onun vasitəsi ilə müsəlman aləminin və bütün dünya ölkələrinin haqq işimizdə dəstəyinə nail olmaq diplomatiyamızın əsas fəaliyyət prinsiplərindən biri oldu. Beləliklə yenicə müstəqillik qazanmış gənc Azərbaycan dövləti önündə müsəlman dövlətlərinin həmrəyliyi, maddi və mənəvi köməyi üçün ümidverici geniş imkanlar açıldı. İƏT, o cümlədən ərəb dünyasının nəhəngləri olan Səudiyyə Ərəbistanı, Misir Ərəb Respublikası, İraq, müsəlman dünyasının liderləri olan İndoneziya, Pakistan, Malayziya və başqa dövlətlərlə də qardaşlıq və dostluq əlaqələri qurmaq Azərbaycan Respublikasının xarici siyasətinin əsas istiqamətlərindən biri kimi Heydər Əliyev tərəfindən müəyyənləşdirildi.

Heydər Əliyevin İƏT Baş Katibi ilə 1994-cü ilin noyabrında Bakıda keçirdiyi görüşlər, həmin ilin dekabrında İƏT dövlət və hökumət başçılarının Kasablankada keçirilmiş 7-ci Zirvə Konfransında iştirakı və İƏT Baş Katibi, həmçinin bir sıra üzv dövlətlərin xahişilə Asiya ölkələri qrupu adından çıxışı Azərbaycanın mövqeyini təşkilat daxilində daha da möhkəmlətdi və üzv dövlətlər tərəfindən dəstəklənməsi imkanlarını artırdı [7, s.327]. Bunun nəticəsində, İƏT Zirvə görüşləri tarixində ilk dəfə, Kasablankada "Ermənistan-Azərbaycan münaqişəsi haqqında" siyasi qətnamə qəbul edilmiş, həmin ildən etibarən İƏT-nin BMT ilə əməkdaşlığı üzrə müzakirə edilən problemlər siyahısına *"Ermənistan-Azərbaycan münaqişəsi"* mövzusunun mütəmadi salınmasına nail olunmuşdur. Həm İƏT Baş Katibliyi, həm də üzv dövlətlərlə aparılmış məqsədyönlü iş nəticəsində, az müddət ərzində İƏT çərçivəsində daha iki - iqtisadi yardımın göstərilməsi, həmçinin Azərbaycanın İslam, mədəniyyət abidələrinin erməni təcavüzkarları tərəfindən məhv edilməsi barədə müvafiq qətnamələr İƏT gündəliyinə daxil edilərək növbəti Zirvə görüşlərində bütün üzv dövlətlər tərəfindən yekdilliklə təsdiq edildi. Gərgin əməyin nəticəsi kimi, siyasi qətnamənin adının dəyişdirilərək daha da gücləndirilməsi və *"Ermənistanın Azərbaycana qarşı təcavüzü haqqında"* başlığı ilə ilk dəfə, 1996-cı ilin dekabrında Cakartada keçirilmiş İƏT Xarici İşlər Nazirlərinin 24-cü Konfransı və 1997-ci ilin dekabrında Tehrandakı keçirilmiş İƏT dövlət və hökumət başçılarının 8-ci Zirvə görüşündə qəbul edilməsi bu məsləyə dair Azərbaycanın haqlı mövqeyinin dünya ictimaiyyətinə çatdırılmasında əhəmiyyətli rol oynamışdır. Misal olaraq, 1994-cü ilin 13 dekabrında Heydər Əliyev İslam Konfransı Təşkilatının üzvü olan ölkələrin Dövlət və Hökumət başçılarının Mərakeşin

Kasablanka şəhərində keçirilən zirvə toplantısında diqqətləri erməni təcavüzünə çəkərək belə qeyd edirdi:

*“Mənim həmvətənlərimin 20 min nəfərindən çoxu öldürülmüş, təqribən 100 min nəfəri yaralanmış və şikəst olmuş, bir milyondan atıq azərbaycanlı öz doğma yurdundan qovulmuş, onların evləri viran edilmiş və yandırılmışdır. Bu adamlar, o cümlədən uşaqlar, qadınlar və qocalar erməni təcavüzkarlarının törətdikləri soyqırımın bütün dəhşətlərini görmüş, qohum-əqrəbalarını itirmişlər. İndi isə sərt qış şəraitində çadır şəhərciklərində dözülməz vəziyyətdə yaşayrlar, soyuqdan donurlar, yoluxucu xəstəliklərə tutulurlar, ərzaq, dərman, pal-paltar sarıdan korluq çəkirlər”* [9, s.70].

Buradan göründüyü kimi Kasablanka Zirvə görüşündə Heydər Əliyev Ermənistanın təcavüzü nəticəsində ölkəmizin düşdüyü ağır vəziyyəti görüş iştirakçılarına çatdırmaqla müsəlman ölkələrinin dəstəyini qazanır. Bir məsələni xüsusilə qeyd etmək lazımdır ki, Heydər Əliyev bu görüşdə bir müsəlman ölkəsinin başçısı kimi təkcə Azərbaycanın problemlərini yox, eyni zamanda digər bölgələrdə yaşayan müsəlman və qeyri-müsəlmanların da problemlərini həll etmək üçün İslam Əməkdaşlıq Təşkilatına üzv olan ölkələrin başçılarına müraciət etmişdir:

*“Öz çıxışımda mən xalqımın ağrı-acılarından danışdım. Bununla yanaşı, Bosniya və Hersevoqinada, Kəşmirdə, Fələstində, dünyanın bütün qaynar nöqtələrində milliyətindən və dinindən asılı olmayaraq başqa xalqların da dərdi və iztirabları məni narahat edir. Bosniya və Hersoqovinada son vaxtlar yaranmış vəziyyət xüsusi təşviş və ürək ağrısı doğurur. Orada qırğın və dağıntılar dəhşətli miqyas almışdır. Ona görə də biz qanlı qırğının dərhal dayandırılması üçün və bu münaqişənin ədalətli aradan qaldırılmasına nail olmaq üçün bütün imkanlarımızdan istifadə etməliyik, var qüvvəmizi sərf etməliyik. Nitqimi bitirərək, mən aramızdakı həmrəyliyə, İslam Konfransı Təşkilatının prinsiplərinə və məqsəd¬lərinə sadiq olduğumu bildirirəm, sülh, sabitlik və tərəqqi naminə hamını öz səylərini birləşdirməyə çağırıram. Mən sizin hamınıza və xalqlarınıza səadət və amin-amanlıq arzulayıram”* [3, s.23].

Ümumiyyətlə Heydər Əliyevin Kasablanka görüşündəki təsirli və mənalı çıxışı ulu öndəri təkcə bir İslam dövlətinin başçısı kimi yox, həm də dünya xalqlarını bəşəri birliyə çağıran bir lider kimi dünyada tanıtmışdır. Yuxarıda dediyimiz kimi Heydər Əliyevin İslam birliyi ideyası, təkcə İslam ölkələrinin birliyi ilə məhdudlaşmır. Araşdırmalar və həyati faktlar göstərir ki, Heydər Əliyevin İslam həmrəyliyi ideyası ümumbəşəri birliyi istiqamətlənmiş qlobal mahiyyət kəsb edirdi.

Digər bir vacib məsələ isə Heydər Əliyevin İƏT-in müxtəlif zirvə toplantılarınd söylədiyi nitqlər və keçirdiyi görüşlər nəticəsində Qarabağ münaqişəsi ilə bağlı müsəlman ölkələrinin yekdil dəstəyini qazanması idi. Əldə edilmiş bu nailiyyət daha sonralar Azərbaycanın iqtisadi, hərbi və informasiya blokadasından çıxarılmasında həlledici rol oynamışdı.

**3.Heydər Əliyev və Ərəb ölkələri ilə münasibətlərin qurulması**

Ölkəmizin təkcə İƏT ilə bütövlükdə deyil, həm də bu təşkilatın və regionun aparıcı dövlətləri olan Səudiyyə Ərəbistanı, Misir Ərəb Respublikası, Pakistan və s. dövlətlərlə də qardaşlıq, dostluq, müttəfiqlik əlaqələri yaratması çox zəruri bir məsələ idi. Əlbəttə, bu siyahının önündə Səudiyyə Ərəbistanı dururdu. Türkiyə və İrandan sonra İslam dövlətləri arasında özünün ilk səfərini də Prezidentimiz bu ölkəyə etmiş, ölkə rəhbərliyi ilə görüşlər keçirmiş, danışıqlar aparmış, İslam dünyasının müqəddəs yerləri sayılan Məkkə, Mədinə və Ciddə şəhərlərini ziyarət etmişdir. Xüsusi olaraq qeyd edilməlidir ki, bu ziyarət Prezidentimizin Kasablanka Zirvə toplantısında iştirakından bir neçə ay öncə baş tutmuşdur.

Heydər Əliyev SSRİ-nin Yaxın və Orta Şərq ölkələrinin rəhbərləri ilə apardığı danışıqlarda və siyasi məsləhətləşmələrdə yaxından iştirak etmiş, çox vaxt bu ölkələrə səfər edən nümayəndə heyətlərinin rəhbəri olmuşdu. Əslində Sovet İttifaqının İslam dünyasında apardığı siyasəti Heydər Əliyev formalaşdırdığını desək heç də yanılmarıq. Onun 1982-1987-ci illərdə Misir, Suriya, İordaniya, Liviya, İraq, Yəmən, Pakistan və başqa müsəlman ölkələrinə səfərləri bütün İslam aləmində aparıcı siyasətçilərdən biri kimi tanınmasına səbəb olmuşdur" [4, s.428]. Akademik Gövhər Baxşəliyeva *"Azərbaycan Respublikasının Şərq siyasəti"* adlı məqaləsində bu mövzu ilə bağlı qeyd edir:

*"Ümumiyyətlə, Heydər Əliyevin Şərq ölkələri, eyni zamanda onların rəhbərləri ilə əlaqələri 70-ci illərdən qurulmağa, formalaşmağa başlamış, Azərbaycan müstəqilliyini qazandıqdan sonra isə indiki vəziyyətə-mehriban qonşuluq və bərabərhüquqlu əməkdaşlıq münasibətləri səviyyəsinə çatmışdır"* [2, s.13].

9 İyul 1994-cü il də Səudiyyə Ərəbistanına rəsmi səfərə yola düşərkən Binə hava limanında müxbirlərin suallarına cavab verən Azərbaycan Prezidenti ilk səfərlərindən birini etməsini bu ölkəyə bu cür aydınlaşdırmışdı:

*"Dünya dövlətləri birliyində Səudiyyə Ərəbistanının özünə layiq yeri var. O, ərəb dünyasının inkişaf etmiş zəngin bir ölkəsidir. Eyni zamanda bu dövlət dünya müsəlmanlarının müqəddəs yerlərinin mühafizidir. Ona görə də bu ölkə ilə Azərbaycan arasında əlaqələr yaradılmalıdır. İndiyədək Səudiyyə Ərəbistanı ilə Azərbaycan arasında, demək olar, heç bir əlaqə olmamışdır. Azərbaycan müstəqillik qazandıqdan sonra bu sahədə*

*müəyyən cəhdlər olsa da, bunlar bir nəticə verməmişdir. Ancaq bu ölkə dünya birliyində böyük nüfuza malik olduğuna görə, dini birliyimizi, tarixi ənənələrimizin oxşarlığını nəzərə alaraq, mən Səudiyyə Ərəbistan məlikinin rəsmi dəvətini qəbul etmişəm və indi səfərə gedirəm. Güman edirəm ki, bu səfər yaxşı nəticələr verəcəkdir. Ən böyük nəticə kimi onu gözləyirəm ki, bizim müntəzəm əməkdaşlığımız üçün imkanlar yaranacaqdır”* [1].

Səfər zamanı Heydər Əliyev İki Müqəddəs Ocağın Xadimi Kral Fəhd, İslam Əməkdaşlıq Təşkilatı, İslam İnkişaf Bankı, İslam Aləmi Liqasının rəhbərləri və b. rəsmi şəxslərlə danışıqlar aparmış və ümrə ziyarəti etmişdir.

Ölkəmiz bu addımlarla nəhayət öz siyasətində yalnız qonşu dövlətlərlə əlaqələr qurmaq çərçivəsindən kənara çıxaraq ilk növbədə hər cəhətdən bizə yaxın və doğma olan Şərqə yönəlir, bununla yanaşı *“İslama qayıdış”* ruhunu yenidən dirçəldir, mənəvi dəyərlərimizin bərpası istiqamətində cəsarətli və lazımlı addımlar atırdı.

Səfər zamanı Azərbaycan Respublikası ilə Səudiyyə Ərəbistanı Krallığı arasında iqtisadiyyat, ticarət, investisiya, texnika, mədəniyyət, gənclər və idman sahələrində əməkdaşlığa dair Baş Saziş imzalanmışdır. Səfərin yekunlarına dair birgə bəyanat qəbul edilmişdir. Bu mühüm səfərdən sonra ölkələrimiz arasındakı əlaqələr dinamik şəkildə inkişaf etməyə başlamışdır.

Azərbaycan ilə Səudiyyə Ərəbistanı arasında əməkdaşlığın inkişaf etdirilməsi, beynəlxalq təşkilatlarda qarşılıqlı əlaqələrin daha da canlandırılınası barədə fikir mübadiləsi aparılmış, Xəzərin Azərbaycan sektorundakı yataqların birgə işlənilməsində Səudiyyə Ərəbistanının yaxından iştirakı və bu ölkənin respublikamızın bir sıra sahələrinə sərmayə qoymasının genişləndirilməsi məsələləri müzakirə olunmuşdur.

Bu illər ərzində müxtəlif sahələrdə çoxsaylı qarşılıqlı səfərlər edilmişdir. Səudiyyə tərəfindən Xarici İşlər Nazirinin müavini, Krallığın İslam İşləri və Vəqflər Naziri, Tikinti nazirinin müavini, Ticarət Sənaye Palatasının sədri səviyyələrində, eyni zamanda iri şirkət rəhbərləri və iş adamlarından ibarət nümayəndə heyətləri Azərbaycanda səfərdə olmuşlar.

Misir Ərəb Respublikası ilə də əlaqələrimiz əslində Heydər Əliyevin 1994-cü ilin sentyabr ayında bu ölkəyə etdiyi səfərlə başlamışdır.

Xatırladırıq ki, Misir dövləti 26 dekabr 1991-ci ildə Azərbaycan Respublikasının müstəqilliyini tanımışdır. 1992-ci ilin noyabr ayında AR Xarici İşlər Nazirinin başçılıq etdiyi nümayəndə heyəti Misirdə səfərdə olmuş, ikitərəfli əlaqələrin inkişafına dair bir sıra sənədlər imzalanmışdır [6].

1994-cü ilin sentyabr ayında Azərbaycan Respublikasının Prezidenti cənab Heydər Əliyev BMT-nin Əhali və İnkişaf üzrə Beynəlxalq Konfransında iştirak etmək üçün Qahirədə işgüzar səfərdə olmuş, səfər

zamanı dövlətimizin başçısı MƏR Prezidenti Hüsnü Mübarəklə görüşür, bu diplomatik münasibətlər Azərbaycan-Misir münasibətlərinin möhkəmləndirilməsində və əməkdaşlığın yeni perspektivlərinin müəyyənləşdirilməsində böyük əhəmiyyət kəsb etmişdir [5].

Ölkəmizin başçısının bu böyük ərəb ölkəsi ilə yaxın əlaqələr yaratmaq istəyi, bu yolda atdığı addımlar öz səmərələrini vermişdir. Bütün beynəlxalq forum və təşkilatlarda, o cümlədən İƏT çərçivəsində keçirilən tədbirlərdə MƏR-in ölkəmizə göstərdiyi dəstək Azərbaycan həqiqətlərinin beynəlxalq ictimaiyyətə çatdırılmasında xüsusi yer tuturdu. Belə ki, Ermənistanın Azərbaycan Respublikasına hərbi təcavüzü ilə əlaqədar baş vermiş hadisələrin BMT-də, İslam Əməkdaşlıq Təşkilatında və digər beynəlxalq təşkilatlarda müzakirəsində Misir Ərəb Respublikası daim ədalətli, çox prinsipial mövqe tutmuş, Azərbaycanın ərazi bütövlüyünü, ölkəmizin ədalətli mövqeyini müdafiə etmişdir.

İordaniya 28 dekabr 1991-ci il də Azərbaycanın müstəqilliyini tanımışdır. Bu ölkə İKT-yə üzv olan dövlətlər arasında Türkiyədən sonra Azərbaycanın müstəqilliyini tanıyan ikinci ölkədir. Ölkələrimiz arasında əlaqələr hələ sovet dövründə də mövcud olmuşdur. Bu dövrdə Heydər Əliyev sovet nümayəndə heyətinin başında İordaniyaya ziyarət etmiş, mərhum kral Hüseyn ibn Təlal ilə görüş keçirmişdir [7, s.327].

Dövlət başçılarımızın 2-ci görüşü Kasablanka Zirvə toplantısında, 13 dekabr 1994-cü ildə keçirilmişdir. Görüşdə Ermənistan-Azərbaycan münaqişəsinin mahiyyəti, bu təcavüzə hüquqi-siyasi qiymət verilməməsinin nəticələri, ATƏT və İƏT xətti ilə görülən diplomatik tədbirlər, mübahisəli beynəlxalq məsələlərin həllində kifayət qədər təcrübəsi olan İordaniya kralının Qarabağ probleminin həllində ən yaxından iştirakı və hər iki ölkəni maraqlandıran bir sıra digər məsələlər müzakirə edilmişdir. 2000-ci ilin 28-30 yanvarında Davos Ümumdünya iqtisadi forumunda Heydər Əliyev ilə İordaniya Kralı II Abdullah arasında ikitərəfli görüş keçirilmişdir [8].

Qeyd etmək lazımdır ki, Heydər Əliyevin müsəlman ölkələri ilə əlaqələrin qurulmasında İraq Respublikası xüsusi yer tuturdu. Belə ki, İraqla Azərbaycan lap qədim zamanlardan çox yaxın olub. Vaxtilə Səfəvilər dövlətinin bir hissəsi olan bu ölkənin şimalında - neftlə zəngin olan Mosul rayonunda etnik cəhətdən bizə çox yaxın olan 2 milyona qədər türkmən yaşayır ki, bu da xarici siyasətimizdə mütləq nəzərə alınmalı faktorlardan biridir. Ölkə əhalisinin 64%-i şiə məzhəbinə məxsusdur ki, bu da bizim dövlətlərin maraqlarının təmasda olduğu nöqtələri artırır. Mədəni-ticari əlaqələrimizin hələ lap qədimdən mövcudluğu da bu qəbildən olan faktorlardandır. Məşhur şairimiz Füzulinin qəbrinin bu ölkədə olması, hələ Sovet İttifaqı dövründə belə bu ölkə ilə əlaqələrə böyük əhəmiyyət verilməsi

və bu əlaqələrin inkişafında Azərbaycanın mühüm rol oynaması, ölkəmizdə İraq iqtisadiyyatı üçün mütəxəssislərin və hərbi kadrların hazırlanması, neft istehsalı və emalı sahələrində birgə əməkdaşlıq, hələ 1970-ci ildən Bakıda İraqın Baş Konsulluğunun fəaliyyət göstərməyə başlaması kimi faktorlar ölkələrimizi bir-birlərinə yaxınlaşdıran amillərdəndir.

Ümumiyyətlə, Heydər Əliyevin ölkəmizə rəhbərlik etdiyi 1993-2003-cü illərdə respublikamız üçün həlledici illər olub. Məhz həmin illərdə dövlətçiliyimizin möhkəm təməli qoyulub. O illərdə Azərbaycanın istər daxili, istərsə də xarici siyasətlə bağlı strateji xətti müəyyən edilib, Azərbaycan dünya birliyinə qovuşub.

**4.Nəticə**

Əsasını ümummilli lider Heydər Əliyevin qoyduğu və bu gün Prezident İlham Əliyev tərəfindən uğurla həyata keçirilən xarici siyasət strategiyası dövlətlərarası regional və beynəlxalq əlaqələrə daha yaxından qatılaraq, Şərq və Qərb dəyərlərinin sintezindən yaranmış cəhətləri özündə əxz edərək dünya birliyinə sıx inteqrasiya olunmaq xəttini seçib. Bu seçimi reallaşdırmaq üçün Azərbaycan dövləti bir tərəfdən dünya təcrübəsini öyrənərək özünün iqtisadi və siyasi inkişaf modelini müəyyənləşdirir, digər tərəfdən isə beynəlxalq aləmdə qəbul edilmiş prinsiplərə uyğun olaraq öz milli maraqlarını qoruyaraq dövlətlərarası əlaqələrə girir.

Hazırda regionda və dünyada baş verən əsas iqtisadi siyasi və mədəni proseslərdə Azərbaycan dövləti layiqincə təmsil olunur, öz mövqeyini bildirir və mənafelərini qoruyur. Ölkə daxilində gedən demokratik proseslər və iqtisadi yüksəlişlə yanaşı, uğurlu xarici siyasət bu gün dünyanın aparıcı dövlətlərinin, nüfuzlu beynəlxalq təşkilatların diqqətini Azərbaycana yönəldib və bu da beynəlxalq hüquq normalarına uyğun qarşılıqlı faydalı əməkdaşlığın yaranmasına və inkişafına əlverişli zəmin yaradıb.

Bu gün dövlət başçısı İlham Əliyevin yürütdüyü siyasət Azərbaycanın regionda və dünyada müttəfiqlərinin sayını xeyli dərəcədə artırıb. Ümummilli lider Heydər Əliyevin xarici siyasət kursunu novatorcasına və dinamik şəkildə davam etdirən Prezident İlham Əliyevin yüksək diplomatik istedadı sayəsində ölkəmizin dünyanın siyasi-iqtisadi mənzərəsini müəyyən edən aparıcı dövlətlərlə və beynəlxalq təşkilatlarla münasibətləri keyfiyyətcə yeni müstəvidə daha da inkişaf edib. Nəticədə, Azərbaycan yalnız beynəlxalq regionda gedən proseslərə deyil, eyni zamanda, beynəlxalq aləmdə cərəyan edən proseslərə də təsir göstərmək imkanı qazanıb. Ona görə də bu gün dünyanı narahat edən, həyati əhəmiyyətli bir sıra problemlərdə aparıcı dövlətlərin başçıları Azərbaycan rəhbərinin mövqeyi ilə hesablaşırlar.

Yuxarıda göstərilənlər onu deməyə əsas verir ki, bu gün Azərbaycanın xarici siyasət strategiyasının uğurla həyata keçirilməsi respublikamızın dünya

miqyasında nüfuzunu xeyli yüksəldib, ölkəmizin Cənubi Qafqaz regionunda lider dövlətə çevrilməsini şərtləndirib. Əsası ümummilli lider Heydər Əliyev tərəfindən qoyulmuş xarici siyasət strategiyasının uğurla davam etdirilməsi müstəqil dövlətimizin dünya birliyində mövqelərinin daha da yüksələcəyinə olan əminliyi artırır.

## ƏDƏBİYYAT

**1.** Azərbaycan qəzeti, Bakı, 10 iyul 1994-cü il
**2.** Baxşəliyeva, G. (2021). Azərbaycan respublikasının Şərq siyasəti. *Azərbaycan Şərqşünaslığı jurnalı, 02 (21),* s/p 13
**3.** Əliyev, H. (1997). *Müstəqilliyimiz əbədidir*. Bakı. Azərnəşr. s. 23
**4.** Orucov, H. (2012). *Azərbaycanda din:ən qədim dövrdən bu günədək*. Bakı: "İdrak İB". s.428.
**5.** https://azertag.az/xeber/AZARBAYCAN_PREZIDENTI_HEYDAR_ALIYEVIN_MISIRA_SAFARI_DAVAM_EDIR-797507
**6.** https://lib.aliyevheritage.org/az/6384687.html
**7.** Hüseynova, İ. (2004). *Müstəqil Azərbaycan dövlətinin qurucusu*. Bakı, səh.327
**8.** Allahverdiyev, Q. (2005). *Heydər Əliyev və Şərq*. Bakı, səh. 201
**9.** Mənəvi Dəyərlərin Təbliği Fondu (MDTF). *Heydər Əliyev siyasəti: Tolerantlıq (çıxışlar, nitqlər, görüşlər,təbriklər)*. Bakı, "Elm və Təhsil" - 2015, s.70

## Роль Гейдара Алиева в построении дипломатических отношений Азербайджанской республики с ближневосточными и мусульманскими странами

**Эльнур Мустафаев***

**Абстракт.** Азербайджанская республика после восстановления 18-го октября 1991-го года своего суверенитета обрела историческую возможность для развития и установления государственности. В данной ситуации согласно принципам национальной государственности формирование и внедрение нового

* Доктор философии по философии,
Заведующий отделом «Религия и общественная мысль» Института Востоковедения им.акад. З.М.Буниятова; Баку, Азербайджан
E-mail: elnur.mustafayev88@mail.ru
https://orcid.org/0000-0001-9784-3466
**Цитировать статью:** Мустафаев, Э. [2023]. Роль Гейдара Алиева в построении дипломатических отношений Азербайджанской республики с ближневосточными и мусульманскими странами. *Журнал «Metafizika», 6*(1), c.198-208.

***История статьи:***
*Статья поступила в редакцию: 21.01.2023*
*Отправлена на доработку: 27.02.2023*
*Принята для печати: 13.03.2023*

внешнеполитического курса являлось самой важной задачей. Неоснованные претензии Армении к Азербайджану, породившие армянский сепаратизм в Нагорном Карабахе, а также расширение военной агрессии способствовали серьезным политическим и экономическим проблемам в стране, а также выдвинули на передний план выполнение основных задач внешнеполитической государственной деятельности. Именно на данном этапе только благодаря продуманной, продолжительной и активной внешней политике стало бы возможным предотвращение военной оккупации Армении, а также тяжелых последствий этого процесса, сохранение территориальной целостности и безопасности государства, политической и экономической интеграции в мир.

Повторное возвращение во второй половине 1993-го года Общенационального Лидера Гейдара Алиева к государственной деятельности создало условия для восстановления независимых государственных идей в Азербайджане. Благодаря этой деятельности во внешнеполитическом курсе Азербайджана стали учитываться существующие реалии и внедрены существенные изменения с целью сохранения национальных интересов. Начиная с данного периода внешняя политика стала неразрывно связана с именем и деятельностью Общенационального Лидера. В статье рассмотрена вторая государственная деятельность Гейдара Алиева, проявленная в строении дипломатических отношений с мусульманскими и арабскими странами Среднего Востока.

**Ключевые слова**: Гейдар Алиев, международные отношения, Ближний Восток, Исламская Организация Сотрудничества, внешняя политика

## The role of Heydar Aliyev in the establishment of diplomatic relations with the Middle East and Muslim countries of the Republic of Azerbaijan

**Elnur Mustafayev**[*]

**Abstract.** After regaining its independence on October 18, 1991, the Republic of Azerbaijan had a historic opportunity to develop and strengthen its statehood. In such circumstances, the formation and implementation of a new foreign policy course in accordance with the principles of national statehood was the most important issue. Armenian separatism, which started in Nagorno-Karabakh with Armenia's groundless territorial claims against Azerbaijan, as well as the expansion of military aggression, not only faced our country with serious political and economic problems, but also brought to the fore the fulfillment of important tasks in the foreign policy of our state. Preventing Armenia's military aggression against our

[*] Doctor of Philosophy in Philosophy,
Head of the Department "Religion and Social Thought" of the Institute of Oriental Studies named after Acad. Z.M. Bunyadov; Baku Azerbaijan
E-mail: elnur.mustafayev88@mail.ru
https://orcid.org/0000-0001-9784-3466

**To cite this article:** Mustafayev, E. [2023]. The role of Heydar Aliyev in the establishment of diplomatic relations with the Middle East and Muslim countries of the Republic of Azerbaijan. *"Metafizika" journal, 6*(1), pp.198-208.

***Article history:***
*Received: 21.01.2023*
*Accepted: 13.03.2023*

country, eliminating its severe consequences, ensuring the territorial integrity and security of our state, and the need to be politically and economically integrated into the world required a thoughtful, consistent and active foreign policy.

In the second half of 1993, the national leader Heydar Aliyev's return to power created conditions for establishing the ideas of independent statehood in Azerbaijan. After that, practical changes were made in the course of Azerbaijan's foreign policy, taking into account the current realities and aimed at protecting the national interests of our country. Our foreign policy implemented since this period is related to the name and activities of the National Leader. The article talks about Heydar Aliyev's activities in the establishment of diplomatic relations with Middle Eastern countries, Muslim and Arab countries during the second years of his power.

**Keywords:** Heydar Aliyev, international relations, Middle East, Organization of Islamic Cooperation, foreign policy

**دور حيدر علييف في إقامة علاقات دبلوماسية مع دول الشرق الأوسط والدول الإسلامية لجمهورية أذربيجان**

**النور مصطفي**

**الملخص:** بعد استعادة استقلالها في 18 أكتوبر 1991، أتيحت لجمهورية أذربيجان فرصة تاريخية لتطوير وتقوية دولتها. في مثل هذه الظروف، كان تشكيل وتنفيذ مسار جديد للسياسة الخارجية وفقًا لمبادئ الدولة القومية هو القضية الأكثر أهمية. إن النزعة الانفصالية الأرمنية ، التي بدأت في ناغورنو كاراباخ بمطالبات أرمينيا الإقليمية التي لا أساس لها ضد أذربيجان، فضلاً عن اتساع نطاق العدوان العسكري ، لم تواجه بلدنا فقط بمشاكل سياسية واقتصادية خطيرة، بل أبرزت أيضاً إنجاز مهام هامة في السياسة الخارجية لدولتنا. إن منع العدوان العسكري لأرمينيا على بلدنا، والقضاء على عواقبه الوخيمة، وضمان سلامة أراضي دولتنا وأمنها، والحاجة إلى الاندماج السياسي والاقتصادي في العالم يتطلب سياسة خارجية مدروسة ومتسقة ونشطة.

في النصف الثاني من عام 1993، أدت عودة الزعيم الوطني حيدر علييف إلى السلطة إلى خلق ظروف لتأسيس أفكار الدولة المستقلة في أذربيجان. بعد ذلك، تم إجراء تغييرات عملية في مسار السياسة الخارجية لأذربيجان ، مع مراعاة الحقائق الحالية بهدف حماية المصالح الوطنية لبلدنا. ترتبط سياستنا الخارجية المطبقة منذ هذه الفترة باسم وأنشطة الزعيم الوطني. يتحدث المقال عن أنشطة حيدر علييف في إقامة علاقات دبلوماسية مع دول الشرق الأوسط والدول الإسلامية والعربية خلال السنوات الثانية من حكمه.

**الكلمات المفتاحية:** حيدر علييف، العلاقات الدولية، الشرق الأوسط، منظمة التعاون الإسلامي، السياسة الخارجية

## REFERENCES

**1.** Azerbaijan newspaper, Baku, July 10, 1994

**2.** Bakhshaliyeva, G. (2021). Eastern policy of the Republic of Azerbaijan. *Azerbaijan Journal of Oriental Studies, 02 (21),* p/p 13

**3.** Aliyev, H. (1997). *Our independence is eternal.* Baku. Azernashr. etc. 23

**4.** Orujov, H. (2012). *Religion in Azerbaijan: from the earliest times to the present day.* Baku: "Idrak PU". p. 428.

**5.** https://azertag.az/xeber/AZARBAYCAN_PREZIDENTI_HEYDAR_ALIYEVIN_MISIRA_SAFARI_DAVAM_EDIR-797507

**6.** https://lib.aliyevheritage.org/az/6384687.html

**7.** Huseynova, I. (2004). *The founder of the independent state of Azerbaijan*. Baku, p. 327

**8.** Allahverdiyev, G. (2005). *Heydar Aliyev and the East.* Baku, p. 201

**9.** Moral Values Promotion Fund (MDTF). *Heydar Aliyev's policy: Tolerance (speeches, speeches, meetings, congratulations).* Baku, "Science and Education" - 2015, p.70